**UOT: 528.28**

# RESPUBLİKANIN FERMER HEYVANDARLIQ TƏSƏRRÜFATLARINDA AKTİNOMİKOZUN YAYILMASI, MÜALİCƏ VƏ PROFİLAKTİKASININ BƏZİ XÜSUSİYYƏTLƏRİ

**A.R.ƏSGƏROV, N.G.QULİYEV, E.E.AXUNDOV**
**AKTN Baytarlıq Elmi Tədqiqat İnstitutu**

*Müstəqillik dövründə Respublikaya xarici ölkələrdən fermer təsərrüfatları üçün gətirilən cins iri buynuzlu heyvanların yerli şəraitə uyğunlaşması, onların müxtəlif infeksion və terapevtik xəstəliklərdən qorunması aktualdır. Bu xəstəliklərdən sayılan aktinomikoz qaramal arasında tez-tez təsadüf edilir ki, nəticədə həmin heyvanlar çox vaxt çıxdaş edilir. Həmin xəstəliyin yayılması səbəbləri, profilaktika və müalicə xüsusiyyətləri mühüm əhəmiyyət kəsb edir.*

***Açar sözlər:*** *Aktinomikoz, İBH, statistika, müşahidə, müalicə-profilaktika.*

Yeni cins heyvandarlıq fermer təsərrüfatlarının yaradılmasını, eyni zamanda mütəxəssislərin çoxsaylı müraciətlərini nəzərə alaraq, xəstəliyin yayılmasının, müalicə və profilaktikasının bəzi aspektlərini göstərməyi lazım bildik.

Aktinomikozun bir xəstəlik kimi öyrənilməsi 1845-ci ildə Langenbeklə başlanmışdır. Bundan sonra xəstəliyin insanlar və heyvanlar arasında yayılması bir çox ölkələrdə aşkar olunmuşdur.

Aktinomikozun hərtərəfli elmi əsaslarla öyrənilməsi 1950-1960-cı illərə təsadüf edir.

Azərbaycan Respublikasında aktinomikozun iri buynuzlu heyvanlar arasında geniş yayılmasına baxmayaraq onun epizootoloji xüsusiyyətləri demək olar ki, az öyrənilmişdir. Bütün bunları nəzərə alaraq biz həmin xəstəliyin heyvanlar arasında yayılması xüsusiyyətlərini və müəyyən müalicə-profilaktika tədbirlərinin effektliyini öyrəndik.

Material və metodlar: Bununla əlaqədar olaraq xəstəliyin müxtəlif iqlim zonalarında yayılma xüsusiyyətləri fəsillərə, heyvanların yaşına, cinsinə görə öyrənilmişdir.

Eyni zamanda xəstəliyin əmələ gəlməsi səbəbləri araşdırılmış, törədicilərin ayrılması, onların patogenliyi müxtəlif qida mühitlərində və hind donuzu üzərində öyrənilmişdir. İqlim zonalarını tədqiq etmək üçün aran zonalarından Goranboy, Yevlax və Kürdəmir, dağətəyi zonalardan Şamaxı və Qazax, dağ rayonlarından Daşkəsən və Gədəbəy rayonları tədqiqat obyekti kimi götürülmüşdür.

Xəstəliyin fəsillərə görə yayılması Şamaxı rayonunun 2, Göygöl rayonunun 1 təsərrüfatında öyrənilmişdir. Bununla bərabər heyvanlar arasında xəstəliyin yayılma dərəcəsi yaş qrupundan, cinsiyyətindən, cinsindən asılılığı öyrənilmişdir.

Profilaktika tədbirləri müxtəlif növ yemlər üzərində (qaba yemlər, küləş, yonca, saman, təbii biçənəkdən yığılan ot) aparılan tədqiqatların nəticələrinə görə, müalicə tədbirləri isə müxtəlif antibiotik və yod preparatları ilə müqayisəli şəkildə aparılmışdır.

Nəticələr və onların müzakirələri: Aktinomikozun iri buynuzlu heyvanlar arasında zonalar üzrə yayılma dərəcəsi aran zonasında Goranboy, Yevlax və Kürdəmir rayonlarının 9 təsərrüfatında öyrənilmişdir. Cəmi 9418 baş iri buynuzlu heyvanlardan 25 başda xəstəlik aşkar edilmişdir. Dağətəyi rayonlarda, Göygöl, Şəmkir və Qazax rayonlarının 9 təsərrüfatında 6859 baş müayinə edilmiş heyvanlardan 499 baş xəstə aşkar olunmuşdur. Dağ zonasında Daşkəsən və Gədəbəy rayonlarının təsərrüfatının 7655 baş qaramalında aktinomikozla xəstə heyvana təsadüf olunmadı.

Xəstəliyin fəsilə görə yayılması Şamaxı rayonunun 2 təsərrüfatında və Göygöl rayonunun 1 təsərrüfatında öyrənildi; sentyabr-noyabr aylarında 3180 baş qaramaldan 54(1,69%), dekabr-fevral aylarında 244 (6,93%), mart ayında 25 (0,69%), iyun-avqustda isə 8 (0,25%) başı xəstəliyə yoluxmuşdur.

Beləliklə, apardığımız tədqiqatlara görə aktinomikoz iri buynuzlu heyvanlar arasında sentyabr-noyabr aylarında, yayılmanın pik nöqtəsi isə dekabr-fevral aylarına təsadüf olunur.

Ədəbiyyat məlumatlarında aktinomikozun heyvanlar arasında əsas yayılma səbəblərdən biri kiflənmiş qaba yemlərin üzərində inkişaf edən patogen aktinomisitlərin zədələnmiş selikli qişaya daxil olması və digər irin törədən mikroblarla birlikdə patoloji prosesin yaranmasıdır.

Xəstəliyin yayılmasında digər infeksiyaların da rolu az deyildir. Belə ki, Qazax rayonunun Dağkəsəmən kəndində yerləşən heyvandarlıq təsərrüfatında

qısa bir müddətdə bir tövlədə 50 baş iri buynuzlu heyvanlar aktinimikozla yoluxmuşlar. Tədqiqat zamanı məlum olmuşdur ki, həmin təsərrüfatda bir qədər əvvəl dabaq xəstəliyi baş vermişdir.

Ədəbiyyat və internet məlumatlarında xəstəliyin yayılmasında cinsiyyətin rolunu göstərən faktora rast gəlmədik.

Tədqiqat zamanı 4102 baş dişi heyvanlardan 259(6,3%), 1384 baş erkək heyvanlardan isə 115 (8,31%) başda aktinomikoz aşkar edildi.

Xəstəliyin yayılmasının yaş qrupuna görə öyrənilməsi zamanı 2 yaşa qədər 1967 baş heyvandan - 158(8,07%), altı yaşa qədər 1168 başdan -73 (6,25%); altı yaşdan yuxarı 2351 başdan 143(6,08%) xəstə heyvan aşkar edildi. Müayinə zamanı 3-4 aylıq buzovlarda aktinomikoza rast gəlsək də xəstəliyə əsas etibarilə 8-12 aylarında daha çox təsadüf edilir.

Ədəbiyyat məlumatlarında (C.N.Vahidov,1973) aktinomikozun daha çox cins heyvanlar arasında yayılması göstərilir.

Bizim öz tədqiqatlarımızda xəstəliyin cinslər arasında yayılma həddini öyrəndikdə aşağıdakıları müəyyən etdik:

Lebedin cinsindən olan 1760 baş heyvandan 278 (15,78%) baş, 685 baş Şvis cinsindən -44(16,42%) baş, 530 baş Qonur Karpat cinsindən -34(6,41%), 663 baş, Qırmızı Eston cinsindən-24 (3,62%), 2016 baş Qonur Qafqaz cinsindən -101(5,01%), 1105 baş Kostroma cinsindən -18(1,49%) xəstə heyvan aşkar edildi.

Beləliklə, təbii şəraitdə xəstəliyə nisbətən davamlı heyvanlar Kastroma, Qırmızı Eston və Qonur Qafqaz cinsi, daha həssas Lebedin cinsi müəyyən edildi.

Müəyyən edilmişdir ki, aktinomikoz iri buynuzlu heyvanlar arsında respublikanın dağətəyi zonalarında daha çox yayılmışdır.

Xəstəlik əsas etibarilə payız və qış aylarında baş verir. Xəstəliyə cins heyvanlar daha çox yoluxurlar və yoluxma nisbəti təxminən eynidir. Bir yaşa kimi erkək danalar daha çox yoluxurlar.

Xəstəliyin əsas mənbəyi rütubətli halda yığılmış qaba yemlərdir. İri buynuzlu heyvanların aktinomikozunun profilaktikasına aşağıdakı tədbirlər daxildir: -İnfeksiyanın mənbəyinin ləğv edilməsi istiqamətində göbələklərin orqanizmə sirayət etməsinin qarşısının alınmasına yönəlmiş tədbirlər.

İnfeksiyanın qarşısının alınmasında ən mühüm şərtlərdən biri qaba yemlərin tədarükünün və saxlanma şəraitinin aqronomik qaydalara uyğun olmasıdır. Eyni zamanda qabagövdəli yemlərin xırda doğranması, qaynar buxardan keçirilməsi, heyvanların selikli qişasının yad cisimlərlə zədələnməsi və ya bəzi xəstəliklərin (dabaq, çiçək, hipovitaminozlar) qarşısının alınması xəstəliyin profilaktikasında əsas rol oynayır.

Təsərrüfatda aktinomikozla xəstə heyvan aşkar edildikdə bütün heyvanlar kliniki baxışdan keçirilməlidir.

Müalicə: Xəstə heyvanlar xüsusi ayrılmış izolyatorda müalicə olunur. Müalicə aşağıdakı üsulla aparılır:

- Əməli müdaxilə; həmin üsul aktinomikoma məhdud və həyat üçün təhlükəsiz sahədə yerləşdikdə şiş nahiyəsi sağlam toxumanı zədələməmək şərtilə kəsib götürülür və açıq yara kimi müalicə olunur. Aktinomikoz həyat üçün təhlükəli nahiyyədə yerləşirsə şişin bir hissəsi götürülür, qalan hissəsi antibiotiklərlə və yod preparatları ilə müalicə olunur. Antibiotiklərdən pensilin, streptomisin və oksitetrasklin işlədilir. Pensilin və streptomitsini şiş nahiyyəsinin müxtəlif dərinliyinə 3-4 yerdən təxminən 500 min vahid, oksitetraskilin isə 400 min vahid yeridilir. Müalicə 1-3 gündən bir təkrar olunur və iki həftəyə kimi davam edir.

Oksitetrasiklinin emulsiyada qarışığı aktinomikozun müalicəsində yaxşı effekt verir.

Kimyəvi preparatlardan ən effektliləri 5-10%-li yod məhlulu və kalium yoddur. Yod məhlulunu gündə 5-10 ml olmaqla şiş nahiyyəsinə, kalium yod isə daxilə verilir.

Müalicə kursu 3-4 həftə təşkil edir.

Müalicənin 5-6, bəzən 10-12 günündə şiş nahiyyəsinin yumşalmış hissəsindən kəsik açılır, nekrozlaşmış toxuma və irin təmizlənir, yaranın içərisi lyüqol məhlulu ilə yuyulur. Həmin preparatdan şprislə şiş ətraflarına yenidən yeridilir.

Müalicə kursu orta hesabla 15 gün davam edir. Heyvanların sağalması bir ay ərzində özünü göstərir.

**ƏDƏBİYYAT**

1. Агарунова Ю.С.Сутеева Т.Г. О чувствительности патогенных аэробных грибков к антибиотикам и сулфанинатидом. «Антибиотики», 1966. 11. 1039-1043. 2. Азимов И.М, Аскеров Д.А. лечение актиномикоза рогатого скота. Тезисы докладов IV Всесоюзной научно-исторической конференции ветеринарных патоанатомов. Казан. 1969. 213-214. 3. Ариевич А.М, Степанишева З.Г. Актиномикоз и нокардиоз. Руководства по микробиологии, клинике и эпидемиологии инфекционных болезней. 1966. Т. 10, 395-407. 4. Афаносьев М.И, Шииц. Н. Актиномикоз. Реальная энциклопедия. 1891. 5. Верестнев Н.М. Актиномикоз и его возбудители. М., 1897. 6. Вахидов С.Н. Актиномикоз крупного рогатого скота в хозяйствах Узбекской ССР и меры борьбы с ним. Автореф.дисс. доктор вет. наук. Одесса, 1973. 7. Голиков Л.В. Лечение крупно-рогатого скота больных

актиномикозом. «Ветеринария», 1963. 7. 15-16. 8. Пошеков. Л. В. Актиномикоз крупного рогатого скота и антибиотико терапия этого заболевания. Дисс. На соискание уч. Степени канд. вет. наук. М.1963. 9. Дроч. Е.М. новое в лечении актиномикоза сельскохозяйственных животных. « Ветеринария». 1960. 11. 69. 10. Кросикьников. Н.А., Гаркина Н.Р. Групповой состав пучистых грибков в актинимикозных узлах. Кн. «Биология отдельных групп актиномицетов». М.А Н СССР, 1965. 269-293. 11. Одухов Н.А., Батуребич Б.Т. К вопроси этиологии и терапии актиномикоза крс. Тр. Отекого ветеринарного ин-та 1963.21. 175-17

**Некоторые особенности распространения актиномикоза крупного рогатого скота в хозяйствах Республики, профилактики и лечения**

**А.Р.Аскеров, Н.Г.Гулиев, Е.Е.Ахундов**

В статье приведены результаты эпизоотологических данных распространения актиномикоза в животноводческих хозяйствах Республики.

Изучены степени восприимчивости крупного рогатого скота в зависимости от климатически условий, пола, породы, рода и зон. Разработаны меры борьбы и методы лечения.

***Ключевые слова:*** *актиномикоз, крс, статистика, наблюдения, лечения-профилактика*

**Some features of the distribution of actinomycosis of cattle in the farms of the Republic, prevention and treatment**

**A.R.Asgarov, N.G.Guliyev, E.E Akhundov**

The article presents the results of epizootological data on the distribution of actinomycosis in livestock farms in the Republic.

Degrees of susceptibility of cattle were studied depending on climatic conditions, sex, breed, genus and zones. Fighting measures and methods of treatment have been developed.

***Key words:*** *actinomycosis, cattle, statistics, control, treatment-prevention*

